# NEW TENDENCIES OF FORMATION OF NEOLOGISMS IN MODERN HEBREW

**Gular Gasimova**[1]

**UDC** 811; 811.411.21.
**LBC** 81.1

**Keywords:**

Linguistic factors
Vocabulary of the language
Calques in translation
Semantic derivations
Lexical suffixes

## ABSTRACT

The development of any language occurs due to the expansion of its morphological, syntactic, stylistic possibilities and an increase in vocabulary, and this process manifests itself at all levels of the language. The enrichment of the vocabulary at the expense of the internal resources of the language occurs through the use of the language of the people, dialects in the literary language, the addition of word-forming suffixes, word combinations, words created by tracing paper and new words (neologisms). The process of enriching the vocabulary of the language at the expense of neologisms, their entry into the object language and the process of assimilation depends on extralinguistic and intralinguistic factors. Creations of neologisms are observed in all world languages. However, the concept of neologism in Hebrew has different and characteristic features. Thus, in some cases, concepts that are common in most spoken languages may differ from Hebrew. In fact, the presence of neologisms for the Hebrew language is perhaps more characteristic than for other languages, because most of this language is in some sense composed of such neologisms. Thus, after two thousand years, this language was returned to the status of an everyday spoken language at the beginning of the 20th century. However, it is clear that the language that was the language of communication two thousand years ago could not fully satisfy the needs of today's spoken language with such a vocabulary. Many Hebrew neologisms were coined in the post-biblical period to express new concepts or to replace existing words as needed.

[1]. Lecturer at the Department of Arabic Philology, BSU
E- mail: gulargasymova@bsu.edu.az

*Received: 21.06.2021*
*Accepted: 07.09.2021*

ISSN: 2790-0029 (Print)
ISSN: 2790-0037 (Online)
JOURNAL OF "HISTORY OF SCIENCE"
Cild 2, Say 3, Sıra 5, 2021, 41-48

# MÜASİR İBRİ DİLİNDƏ NEOLOGİZMLƏRİN YARANMASINDA YENİ TENDENSİYALAR

**Gülər Qasımova** [1]

**UOT** 811; 811.411.21.
**KBT** 81.1

**Açar sözlər:**

Linqvistik amil
Dilin lüğət tərkibi
Kalka tərcümələr
Semantik derivasiyalar
Sözdüzəldici şəkilçilər

**ANNOTASİYA**

Hər hansı bir dilin inkişafı onun morfoloji-sintaktik, üslub imkanlarının genişlənməsi və lüğət tərkibinin artması hesabına baş verir və bu proses dilin bütün səviyyələrində özünü göstərir. Leksik səviyyədə müşahidə olunan inkişaf, dilin daxili imkanları hesabına və leksik alınmalar hesabına baş verir. Dilin öz daxili imkanları hesabına lüğət tərkibinin zənginləşməsi xalqın dilindən, dialektlərdən alınaraq ədəbi dildə işlədilməsi ilə, sözdüzəldici şəkilçilər artırılması, söz birləşmələri vasitəsi ilə, kalka yolu ilə yaradılan sözlər və dilə daxil olan yeni sözlər (neologizmlər) hesabına baş verir. Neologizmlər hesabına dilin lüğət tərkibinin zənginləşməsi, onların obyekt dilə daxil olması və mənimsənilməsi prosesi ekstralinqvistik və intralinqvistik amillərdən asılıdır. Dünya dillərinin hamısında neologizmlərin yaranması müşahidə olunur. Lakin ibri dilində neologizm anlayışının başqa dillərdən fərqli və xarakterik xüsusiyyətləri vardır. Belə ki, bir sıra hallarda əksər danışıq dilləri üçün bir qayda olaraq qəbul edilmiş anlayış və qavramlar ibri dilinə münasibətdə fərqli ola bilir. Əslində, ibri dili üçün neologizmlərin mövcudluğu, bəlkə də, başqa dillərə nisbətən daha xarakterikdir, çünki bu dilin böyük bir hissəsi müəyyən mənada elə neologizmlərdən ibarətdir. Belə ki, iki min il fasilədən sonra bu dil XX əsrin əvvəllərindən etibarən yenidən gündəlik danışıq dili vəziyyətinə gətirilmişdir. Ancaq aydındır ki, iki min il əvvəl ünsiyyət dili olmuş bir dil həmin lüğət tərkibi ilə bu gün danışıq dilinə olan ehtiyacları tam olaraq ödəyə bilməzdi. İbri dilində bir çox neologizmlər Bibliya dövründən sonrakı dövrlərdə tələbata uyğun olaraq yeni məfhumların ifadəsi üçün, yaxud mövcud sözlərin əvəzlənməsi üçün yaranmışdı.

[1]. BDU-nun Ərəb filologiyası kafedrasının müəllimi
E- mail: gulargasymova@bsu.edu.az

*Məqalə redaksiyaya daxil olmuşdur: 21.06.2021*
*Təkrar işlənməyə göndərilmişdir: 09.07.2021*
*Çapa qəbul edilmişdir: 07.09.2021*

# НОВЫЕ ТЕНДЕНЦИИ ОБРАЗОВАНИЯ НЕОЛОГИЗМОВ В СОВРЕМЕННОМ ИВРИТЕ

**Гюляр Гасымова**[1]

**УДК** 811; 811.411.21.
**ББК** 81.1

**Ключевые слова:**

Лингвистические факторы
Словарный состав языка
Калькирование в переводе
Семантические деривации
Лексические суффиксы

**АННОТАЦИЯ**

Развитие любого языка происходит за счет расширения его морфолого-синтаксических, стилистических возможностей, а так же увеличения словарного запаса, и этот процесс проявляется на всех уровнях языка. Обогащение словарного запаса за счет внутренних ресурсов языка происходит за счет использования языка народа, диалектов в литературном языке, добавления словообразующих суффиксов, словосочетаний, слов, созданных калькой и новых слов (неологизмы). Процесс обогащения словарного запаса языка за счет неологизмов, их вхождение в объектный язык и процесс их усвоения зависит от экстралингвистических и внутрилингвистических факторов. Создание неологизмов наблюдаются во всех мировых языках. Однако, концепция неологизмов в иврите отлично и имеет характерные черты. Таким образом, в некоторых случаях, концепции и понятия, общепринятые для большинства разговорных языков, могут отличаться в иврите. Фактически, наличие неологизмов для еврейского языка, возможно, более характерно, чем для других языков, потому что большая часть этого языка в некотором смысле состоит из таких неологизмов. Таким образом, после двух тысяч лет этому языку был возвращен статус повседневного разговорного языка в начале XX века. Однако очевидно, что язык, который был языком общения две тысячи лет назад, не мог полностью удовлетворить потребности сегодняшнего разговорного языка с таким словарным запасом. Многие еврейские неологизмы были придуманы в постбиблейский период для выражения новых концепций или для замены существующих слов по мере необходимости.

[1]. Преподаватель кафедры арабской филологии БГУ. Азербайджан, Баку.
E- mail: gulargasymova@bsu.edu.az

## Giriş

Bütün dünya dillərində dilin lüğət tərkibinin inkişafında ictimai- siyasi hadisələrin təsiri böyükdür. Belə ki, cəmiyyətin iqtisadi, siyasi, ictimai- mədəni həyatındakı inkişafla əlaqədar olaraq dilin leksik- terminoloji potensialının zənginləşməsinə real zəmin yaranır. Dilin yeni sözlərlə zənginləşməsi və mövcud mənalarının dəyişilməsi ictimai həyatda və ictimai fikirdə yaranan yeni inkişafla əlaqədardır. Dilin lüğət tərkibinin zənginləşməsinin əsasında dildə olan sözlərin semantik mənasının genişlənməsi, söz yaradıcılığı üsulları, başqa dillərdən tərcümə prosesi və alınmalar durur (3, s. 72). Bu proseslərin hər biri dilin lüğət tərkibinin zənginləşməsində və dilə çoxsaylı neologizmlərin daxil olmasında müəyyən vəzifə icra edir.

Həyatımızda, məişətimizdə baş verən yeniliklər neologizmlərin yaranması səbəbinə çevrilir. Neologizmlərdən danışarkən dilçiliklə bu terminin nəyi ehtiva etdiyi barədə məlumat vermək ehtiyacı yaranır. Neologizm sözü yunan mənşəli olmaq etibarilə “neos” – yeni, “loqos” – anlayış) istənilən dildə hər hansı yolla yeni yaranmış, təbii tələbat nəticəsində ortaya çıxmış sözü, ifadəni, söz birləşməsini bildirir (1, s. 136). Dildə yeni olmaq o deməkdir ki, bu qəbildən olan sözlər digər işlək sözlərdən fərqlənir. Neologizmlər ictimai həyatın, elmin, texnikanın, mədəniyyətin, siyasətin və iqtisadiyyatın inkişafı ilə bağlı olaraq yaranır, 5-10 il ərzində dilin lüğət tərkibində yeni söz olaraq qalır. Hamı tərəfindən başa düşüldükdən sonra, öz yeniliyini itirir. Bu səbəbdən də neologizm anlayışı nisbi bir anlayışdır. Bu anlayışın yenilik əlaməti də müvəqqətidir.Ümumişlək sözə çevrildikdən sonra neologizmlər köhnəlmiş sözlər cərgəsinə keçməklə tarixizmlər sırasında yer alır. Deyilənləri nəzərə alaraq neologizmlərə belə bir tərif vermək olar: dildə mənalı vahid kimi əmələ gəlmiş, yeni əşya, hadisə və məfhumları adlandıran, öz yeniliyini və təzəliyini hiss etdirən və hələ dilin aktiv lüğət fonduna aid olmamış sözlərə neologizmlər deyilir (3, s. 74).

### İbri dilinin tarixi inkişaf dövrlərində neologizmlərin yaranmasını şərtləndirən amillər və yeni sözlərin qrupları

Tel-el-Amarna məktublarından biz artıq miladdan əvvəl 14-cü əsrdə qədim ibri dilində hal-hazırda da gündəlik danışıqda istifadə edilən אני [’ani]-mən, קיץ [kayits]-yay, עפר [‘afar]-kül, חמוד [xamud]-xoş, cəlbedici, חומה[xoma]-qala divarı, כלוב [kluv]-qəfəs, לבנה [levana]-ay, מחסור [maxsor]-çatışmazlıq, שער [şa‘ar]-şəhər meydanı, darvaza, שדה [sade]-çöl, tarla, סוס [sus]-at, מס [mas]-vergi və bunun kimi 15-ə yaxın sözün olduğunu öyrənirik.

İbri dilində işlənən sözlərin təxminən 14.000-i “müdriklərin dövrü” adlandırdığımız Mişna dövrünə aiddir (6, s. 82). Bu rəqəm özü ilkin orta əsrlərdə ibri dilində nə qədər yeniliklərin və neologizmlərin yarandığından xəbər verir. Professor Xayim Rabin yazır ki, bu dövrün ibri dili tarixindəki əhmiyyəti o qədər böyükdür ki, dil dirçəldildiyi zaman dilçilər Əhdi-Ətiq və ya Mişna dövrü ibri dillərindən hansını seçəcəkləri barədə mübahisədən sonra qərara almışdılar ki, hər iki mənbədən istifadə olunsun. Belə ki, ibri dilinin bu iki dövrü arasında həm leksik, həm morfoloji, həm də sintaktik fərqlər yetərincədir. Bir çox hallarda eyni mənalı anlayışlar onlarda fərqli şəkildə ifadə edilir. Məsələn, Əhdi-Ətiq və Mişna dövrü dillərində uyğun olaraq עף [‘af] və חוטם [xotem] burun, לקח [lakax] və נטל [natal] götürmək, עץ [‘ets] və אילן [’ilan] ağac, עתה [‘eta] və עכשיו [‘axşav] indi, תווך [tavex] və אמצע[’emtsa‘] orta deməkdir.

Əslində, dilçi alimlər bu iki dövr dilləri arasında rəqabətdən doğa biləcək dil anarxiyasından çəkinərək məsələnin həllinə çalışarkən İsrail cəmiyyəti özü problemi həll etdi. Müasir ibri dilində hər iki dövrün lüğət tərkibindən istifadə olunur, ancaq bir çox hallarda əvvəllər eyni mənanı ifadə etmiş iki sinonim söz indi müxtəlif məna çalarları ilə

işlənirlər. Məsələn, שפה [safa] sözü yalnız danışılan dil mənasında işləndiyi halda, לשון [laşon] sözü həm danışılan dil, həm də fiziki orqan olan dil mənalarını verir. Yaxud לעוף [la‘uf] sözü heyvanların uçmasını bildirdiyi halda, לטוס [latus] sözü təyyarənin uçuşunu ifadə edir və s. Bu feil köklərindən yaranan isimlər də yalnız yaradıqları feilin məna çalarını daşıyırlar. Məsələn: עוף [‘of-quş], מטוס [matos]-təyyarə.

İbri dili tarixində bu dövrdən sonra gələn və yeni sözlərin yaradılmasında heç də az rola malik olmayan "Piyut ədəbiyyatı" dövrü də mühüm yer tutur. Belə ki, bu növ ədəbiyyat janrı nümayəndələri tərəfindən ibri dilinə külli miqdarda yeni sözlər daxil olmuşdur. Bu dövrün paytanları (piyut müəllifləri) uyğun olmaq üçün bəzən sözləri qısaldır, məna və formaca dəyişdirirdilər (6, s. 108). Bu dövrdə yaranmış bir çox sözlər müasir ibri dilinin lüğət fonduna daxildir: אפס ['efes-sıfır],חיבור [xibbur-üstəgəl],חיסור [xissur-çıxma], מרכז [merkaz-mərkəz], קוטר [koter-diametr, kalibr], קוטב [kotev-qütb], חילוק [xilluk-bölmə], משולש [meşullaş-üçbucaq], חשבון [xeşbon-hesab] və s.

Abba Even-Şoşan özünün "İbri dilinin yeni lüğəti"ndə qeyd edir ki, təxminən 37000 yeni sözün 8000-i Əhdi-Ətiq, bir o qədəri Talmud (Tövratın təfsiri), 6000-i orta əsrlər və 15000-i yeni dövrə məxsusdur (14). Ancaq müasir ibri dilli mətnlərin araşdırılması göstərir ki, Əhdi-Ətiq dövrünə məxsus sözlər dildə daha çox işlənmə tezliyinə malikdir.

İbri dilinin tarixi inkişaf dövrlərində dilin zənginləşməsində mühüm rol oynayan neologizmləri semantik cəhətdən belə qruplaşdırmaq olar (6, s. 93):

1) ictimai-siyasi mənalı sözlər: ibri dilində bu qəbildən olan פרלמנט (parlament), קומוניסט (komunist), פרוטוקול (protokol), טקטיקה(taktika) və s. kimi sözlərini nümunə göstərə bilərik;
2) məişətlə bağlı olanlar: məişət cəmiyyətin elə bir sahəsidir ki, kənarda baş vermiş hər hansı yenilik ona birbaşa təsir edir. Belə sözlərə רדיו (radio), וידאו (video), סרוויס (servis) və s. nümunə göstərə bilərik.
3) elm və texnikanın müxtəlif sahələrinə aid olanlar: elmi-texniki inqilablar dövrü kimi səciyyələndirilən müasir dövrümüzdə bu sahənin rolu və əhəmiyyəti nəhayətsizdir. İbri dilində müxtəlif dillərdən alınmış, elm və texnikanın ayrı-ayrı sahələrinə aid olan terminlərə daha çox rast gəlmək olur. Bu cür terminlərin ümumxalq səciyyəsi qazanmaq potensialı xüsusilə böyükdür. Bu sözlərə ליקוצית (leykosit), פלזמה (plazma), סינוס (sinus), אינטגרל (inteqral), טנגנס (tanqens), ארגומנט (arqument), רדיוס (radius) və s. sözləri misal göstərə bilərik;
4) incəsənətin müxtəlif sahələrinə aid olanlar: ibri dili incəsənət leksikasının əsası milli sözlərdən ibarət olsa da burada başqa dillərə məxsus söz və ifadələr də müəyyən faiz təşkil edir: קלרנט (klarnet), מוזיקה (musiqi) və s.
5) iqtisadiyyat və nəqliyyata aid olanlar: bu qrupa aid sözlər daha çox milli zəmində yaransa da, başqa dillərdən alınmış sözlər də xüsusi lay təşkil edir. İqtisadiyyatın eninə və dərininə inkişafı bu sahəyə aid bir sıra yeni sözlərin meydana çıxmasına səbəb olmuşdur. Belə ki, iqtisadiyyatla bağlı olan טרסט (trest), טרקטור (traktor), קומביין (kombayn), מטרו (metro) və s. sözlər ibri dilində geniş işlənmə tezliyinə malikdir;
6) hərbi sahəyə aid olanlar: rus və Avropa dillərində yaranmış hərbi terminlərin böyük əksəriyyəti ibri dilinə keçmiş və lüğət tərkibinə daxil olmuşdur. Həmin sözlər işlənmə dairəsi və anlaşma dərəcəsinə görə ümumişlək sözlərə çox yaxındır: אדמירל (admiral), גוורדיה (qvardiya), בטליון (batalyon), קפיטן (kapitan), גנרל (general), טנק (tank) və s. söz bu qəbildəndir.

**İbri dilində neologizmlərin yaranma yolları**

XIX əsrin sonu, XX əsrin əvvəllərində ibri dilinin dirçəldilməsinə çalışan yəhudi alimləri ibri dilində yeni sözləri yaradarkən əsasən üç üsuldan istifadə edirdilər (6, s. 73):

1) Əhdi-Ətiq və ya Mişna-Talmud dövrü dillərinə müraciət. Xüsusən, Mişna və Talmud dövrü ədəbiyyatı Əhdi-Ətiq

mətnlərinə nisbətən daha gənc olduğuna görə daha effekriv idi. Məsələn, אורז [’orez-düyü], שעועית [şe‘u‘it-lobya, אספסת [’aspeset-qarayonca], סלק [selek-çuğundur], קלמית [kalanit-anemon (çiçək növü)] kimi sözlər bu dövr ibri dilinin lüğət tərkibinə aiddir.

2) Köhnə sözlərə yeni mənaların verilməsi. Məsələn, əvvəllər ancaq “top” (oyun üçün) mənasında işlənən כדור [kadur] sözü indi həm “güllə”, həm də “həb” mənasını ifadə edə bilir. Yaxud Əhdi-Ətiq ibri dilində מוקש [mokeş] sözü “tələ” mənasında işlənir. Ancaq müasir ibri dilində bu söz “mina” mənasında başa düşülür. Və ya həftəlik dualardan birinin adı olan מוסף [musaf (“əlavə edilən” deməkdir) sözü bu gün ibri dilində qəzetlərə verilən əlavəni bildirir. Bu kimi sözlərə Əhdi-Ətiqdə şəkil,– forma mənasında işlənmiş צלם [tselem] (müasir dildə: צילם [tsilem]-şəkil çəkmək, מצלמה [matslema]-fotoaparat, תצלום [tatslum]-fotoşəkil, צלמניה [tsalmaniya]-fotostudio), toppuz mənasında işlənmiş תותח [totax] (bu gün: top (silah mənasında)), sapand mənasını verən מקלע [mikla‘] (müasir dildə: pulemyot) yeniliklərini də əlavə etmək olar.

3) Mövcud olan köklərdən yeni sözlərin yaradılması. Bu üsul ibri dilində söz yaradıcılığı sahəsində ən geniş yayılmış və ən effektiv üsuldur. Burada ibri dilinin güclü flektivlik qabiliyyəti böyük rol oynayır. Misal üçün, “mətbəx” sözünün ifadəsi üçün חדר הבישול - [xadar habişul] (hərfən: bişirmə otağı) və בית הבישול - [beyt habişul] (hərfən: bişirmə evi) kimi kəlmələr işlənsə də, sonradan alimlər “bişirmək” mənasını verən -טבח- [tet-bet-xet] kökünə -מ- [mem] prefiksi artırmaqla mitbax sözünü dilə daxil etdilər (bu sözün yaradılmasını kalka məna tərcüməsi kimi də qəbul etmək olar. Belə ki, eyni üsulla eyni kökdən yaranmış «mətbəx» sözü ərəb dilində daha əvvəllər mövcud olmuşdur). Yaxud “yemək” feilini bildirən סעד [samex-‘ayn-dalet] kökündən מסעדה [mis‘ada]-restoran sözü yaradıldı və s.

Dirçəliş prosesi zamanı ifadə və sözlərin işlənməsində yüngüllüyə və yığcamlığa fikir verilirdi (7, s. 29). Bu zaman uzun və çətin sözlərə alternativ yeni sözlər yaradılırdı. Məsələn:

עגלה חשמלית [‘aqala xaşmalit]-tramvay → חשמלית [xaşmalit]

גנב כיס [qanav kis]-cibgir → כייס [kayyas]

Bir sıra neologizmlər sinonimlərin əvəzlənməsi yolu ilə əmələ gəlirdi:

באבדון לב [be’avdon lev]-təəssüflə → בצער [betsa‘ar]

סימני העתק - [simaney he‘tek]-mötərizə → מרכאות [maxre’ot] və s.

Bir çox latın-avropa mənşəli sözlər ibri dilinin öz sözləri ilə əvəzlənirdi:

אגיטציה [’aqitatsiya]-təşviqat → הסתה [hassata]

אמיניסטרציה [’administratsya]-müdiriyyət → מנהל [minhal]

İbri dilində söz yaradıcılığında bənzəri olmayan və müəyyən qədər kalka tərcümələrə oxşayan bir dil hadisəsi müşahidə edilir. Belə ki, bəzi hallarda müəyyən neologizmi ibri dilinə hərfi tərcümə etmək əvəzinə həmin neologizmlə fonetik oxşarlığı çox böyük olan və mənaca da onuna uyuşan ibri söz və ya söz birləşməsini yeni sözün ibri dilindəki ekvivalenti kimi təqdim edirlər (10, s. 184). Məsələn, Avropa dillərindən keçmə söz olan “teleqraf” kəlməsini ibri dilində דילוג רב [diluq-rav]-uzun sıçrayış, ingilis dilində “top” (silah) mənasında işlənən “cannon” sözünü קנה און - [kneh’on]-güc lüləsi, “xolera” sözünü חולי רע [xoli ra‘]-pis xəstəlik, “protokol” sözünü פרטי כל [pratey kol]-hər şeyin xırdalığı (detalları) kimi işlədirlər (Azərbaycan dilində xalq arasında, xüsusən, qocalar tərəfindən “pasport” kəlməsinin “başbilet” kimi tələffüz edilməsi ibri dilindəki bu nümunələrə olduqca oxşayır). Əslində bu yolla elə də çox söz yaradılmayıb və bu üsul daha istifadə olunmur. Ancaq bu təzahür dilçilərə sözlərin yaradılmasının fərqli bir yolunu təqdim edir.

İbri dilində neologizmlərlə bağlı diqqəti çəkən məqamlardan biri də müxtəlif affikslərin köməyi ilə yeni feillərin yaradılmasıdır. Belə ki, dil dirçəldilərkən yəhudi alimləri qədim dövrlərdə işlənən müxtəlif isim və feillərə müvafiq affikslər əlavə edərək yeni mənanı ifadə edən çoxsaylı

feil yaradırdılar (7, s. 89). Bu prosesi aşağıdakı kimi ümumiləşdirmək olar:

1) Feil köklərinin əvvəlinə -א- [’alef] prefiksinin artırılması:

פשר [paşar] məna → אפשר [’ifşer]- imkan vermək, imkan yaratmaq

לחש [laxaş] zəif, zəiflətmək → אלחש [’ilxeş]- keyitmək

2) Feil köklərinin əvvəlinə -ת- [tav] prefiksinin artırılması:

פקד [pakad] əmr → תפקד [tifked]- fəaliyyət göstərmək, iş yerinə yetirmək

חלב [xalav] süd → תחלב [tixlev]- emulsiya çəkmək

3) Feil köklərinin əvvəlinə -ש- [şin] prefiksinin artırılması (bu prefiks ibri dilində bir çox hallarda ingilis dilində -re- ön şəkilçisinin yerinə yetirdiyi funksiyanı daşıyır:

עבד [‘avad]- işləmək → שעבד [şi‘bed]- istismar etmək

טען [ta‘an]- yükləmək → שטען [şit‘en]- yenidən yükləmək

4) Feil köklərinin sonuna -ן- [nun] prefiksinin artırılması:

עצב [‘atsav]- dilxor etmək, məyus etmək → עצבן [‘itsben]- əsəbiləşdirmək

חרב [xarav]- dağılmaq, tükənmək → חרבן [xirben]- xaraba qoymaq

İbri dilində yeni sözlərin bir qismi isə müxtəlif semantikaya malik modellərin köməyi ilə düzəldilir (11, s. 74):

1. □□□ מ [maktel] modeli. Bu model vasitəsilə adətən, iş alətlərinin, peşələrin adları, həmçinin, müxtəlif isimlər düzəlir: מלבן [malben-düzbucaqlı], משבר [maşber-böhran], מגהץ [maqhets-ütü], מסרק [masrek-daraq] və s.;
2. מ□□□□ה [maktelah] modeli: מצלמה [matslema-fotoapparat]-fotoaparat, מאפרה [ma’afera-külqabı], מעשבה [ma‘aseva-herbari] və s.
3. □□□ מ [miktal] modeli: מברק [mivrak-teleqram], מבחן [mivxan-imtahan], מסמך [mismax-sənəd], משמר [mişmar-gözətçi], מאבק [ma’avak-mübarizə], מאסר [ma’asar-həbs], מעשה [ma‘aseh-əməl], משטר [miştar-rejim] və s;
4. □□□ [kattal] modeli. Bu model vasitəsilə bir çox peşə və fəaliyyət adları düzəlir (13): טייר [tayyar-turist], צייר [tsayyar-rəssam], מלח [mallax-dənizçi], ספר [sappar-bərbər], צלם [tsallam-fotoqraf] və s;
5. □□□ן [katlan] modeli ilə adətən, peşə və kimyəvi element adları, yaxud xüsusiyyətlər ifadə olunur: רקדן [rakdan-rəqqas], דברן [davran-çox danışan], מימן [meyman-hidrogen], חמרן [xamran-alüminium], שמרן [şamran-konservator], פחמן [paxman-karbon] və s;
6. □□י□ה [ktilah] və ya □□ו□ה [ktulah] modeli ilə adətən, feili isimlər düzəlir (bu model pa‘al feil əsasından isimlər düzəltmək üçün istifadə olunur: כתיבה [ktiva-yazma], עבודה [‘avoda-iş], כניסה [knisa-giriş], יציאה [yetsi’a-çıxış], הריגה [hariqa-qətl], הליכה [halixa- gediş] və s;
7. ת□ו□ה modeli ilə adətən, samitlərindən biri zəif olan köklərdən müxtəlf isimlər düzəlir: תהוגה [tehudah-titrəşim], תעוה [te‘udah-vəsiqə], תגובה [tquvah-reaksiya, cavab], תמונה [tmunah-şəkil, portret], תמונה [trumah- qurban], תרופה [trufah-dərman] və s.;
8. □□□ת [katelet] və ya □□ו□ת [ktolet] modeli: עטרת [‘ateret- tac], נחושת [nexoşet-mis], מיימת [mayemet- suçiçəyi,] צהבת [tsahevet- sarılıq], כתובת [ktovet-ünvan] və s.;
9. □י□ו□ [kitul] modeli pi‘el babı feillərindən isimlər əmələ gətirir: פירוז [peruz-demilitarizasiya], ניצול [nitsul-istismar], בילוי [biluy-vaxt keçirmə], שיפוץ [şiputs-təmir], סיפור [sipur-hekayə], və s.

**Nəticə**

XXI yüzillikdə dünya əhalisinin əksəriyyəti sənaye cəmiyyətindən informasiya cəmiyyətinə keçid edərkən dilin lüğət tərkibi kütləvi dəyişikliklərə məruz qalır. Belə ki, sənaye cəmiyyəti maddi sərvətlərin, sənaye məhsullarının, təbii resursların hasilatı və emalı hesabına formalaşan bir cəmiyyət hesab olunduğu halda, informasiya cəmiyyətində informasiya bilikləri əsas maddi sərvət idi. Kompüter və internet yaranarkən isə dünya mədəniyyət tarixində informasiya inqilabı baş

verdi. Bu informasiya inqilabı nəticəsində nəticəsində elmin və yeni texnologiyaların sürətli inkişafı səbəbi ilə bir çox dillərdə informatika, texnologiya, kompüter elmləri və s. sahələrə dair yeni-yeni sözlər əmələ gəlməyə başlamışdır. Beləliklə, iqtisadi-siyasi və mədəni həyatda baş verən dəyişikliklərlə əlaqədar olaraq insanların yeni anlayışları ifadə etmək üçün yeni sözlər yaratmaq zərurəti dildə neologizmlərin meydana gəlməsi üçün əsas səbəb olmuşdur. Dildə yenicə yaranan və ya təzəcə daxil olan ifadənin müəyyən müddətdən sonra yeni bir ifadə və ya söz ilə əvəzlənməsi neologizmlərin sürətlə dəyişməsinə gətirib çıxarır. Buna görə neologizmlər nisbi və şərti götürülür, dövrlərlə əlaqədar olan bir hadisə kimi anlaşılır. Belə ki, XX əsrin sonlarında ibri dili üçün neologizm hesab olunan bəzi sözlər, XXI əsrdə digər yeni bir sözlə ifadə olunduğu üçün öz neologizmliyini itirmiş olur. Bu sözlər dilin digər aktiv sözlərindən fərqlənmədiyi üçün, təzəlik xüsusiyyətini göstərən üslubi keyfiyyətini qorumadığına görə neologizm hesab olunmurlar.

İbri dilində olan neologizmlərin tarixini, yaranma mənbəyini, yaranma amilini, yaranma səbəbini, genealoji tərkibini, növlərini, qruplarını, elementlərini və s. kimi səciyyəvi xüsusiyyətlərini tədqiq etsək görərik ki, müasir dövrdə alınmalar, beynəlmiləl və ya internasional sözlər, müəyyən elm və digər sahələrə dair yeni terminlər dildə öz neologizm xüsusiyyətini qoruyur. İbri dilində neologizmlər əsasən leksik və qrammatik yolla yaradılır. Leksik yolla yaradılan neologizmlər dedikdə dilin öz daxili imkanları hesabına yaranan yeni sözlər və alınmalar başa düşülür. Qrammatik üsulla əmələ gələn yeni sözlər isə morfoloji və sintaktik yolla yarananlar olmaqla iki qrupda öyrənilir. Qrammatik üsulla söz yaradıcılığı dili məhz əcnəbi mənşəli sözlərin təsirindən kənarda tutur və ya dilə təzəcə daxil olmuş alınma sözü ibri dilinin qrammatik qayda-qanunlarına uyğunlaşdırır. Morfoloji üsulla söz yaratma müxtəlif model və affikslərin köməyi ilə yaranan neologizmləri ehtiva edir. Sintaktik üsulla isə yeni sözlərin yaradılması zamanı iki müxtəlif sözün müəyyən hərfləri və hecaları bir-birinə qovuşaraq yeni formalı və yeni məzmunlu sözlər əmələ gətirir. Abbreviatura və ixtisarlar məhz bu yolla əmələ gəlir.

## Ədəbiyyat siyahısı (References)

1) Axundov A., Məmmədov N. "Dilçiliyə giriş", Bakı 1980
2) Qurbanov A., " Ümumi dilçilik", Bakı 1987
3) Rəcəbli Ə. "Dilçiliyə giriş", Bakı 2008
4) Айхенвальд А.Ю. «Современный иврит», Москва 1990
5) Кодухов В.И. «Введение в общее языкознание» Москва, 1979
6) Крюков А.А. «Краткая история возрождения разговорного иврита», Москва 2003
7) Ламбдин Т.О. «Учебник древнееврейского языка», Москва 1998
8) Kautsch, E.Gesenius' Hebrew Grammar. 2nd English ed. Trans. A.E.Cowley.Oxford: Clarendon, 1962
9) Lewis Glinert "Modern Hebrew, an essential grammer", USA 2005
10) Zippi Lyttleton and Tamar Wang "Colloquial Hebrew", Canada, 2004
11) א.לאודן ורות שושן "שעת עברית„ תל-אביב 1991
12) http://www.garshin.ru/linguistics/scripts/proto-abc.html
13) http://hamelamed.narod.ru/pravila.htm
14) http://www.philology.ru/linguistics3/stasiuk-02.htm
15) www.linguistics.uiuc.edu/people/benmamoun/index.html